# MÜKAFATLAR

2014-cü ildə Azərbaycan Milli Elmlər Akademiyasının Rəyasət Heyəti alimləri daha yüksək səviyyəli tədqiqatlar aparmağa təşviq etmək, eləcə də Azərbaycanın bir sıra görkəmli alim və mütəfəkkirlərinin xatirəsini əbədiləşdirmək məqsədilə "Azərbaycanın görkəmli alimlərinin adına AMEA-nın mükafatlarının təsis edilməsi haqqında" qərar qəbul etmişdir. Həmin qərara uyğun olaraq, Azərbaycan elminin inkişafındakı xidmətlərinə görə 7 alim AMEA-nın görkəmli alim və mütəfəkkirlərin adına təsis edilmiş mükafatları ilə təltif olunmuşdur. Çox sevindirici haldır ki, ilk mükafat alan alimlər sırasında AMEA Biologiya və tibb elmləri bölməsinin üzvləri də vardır.

## AMEA-NIN HƏSƏN BƏY ZƏRDABİ ADINA MÜKAFATI – C.Ə.ƏLİYEV



Azərbaycan Milli Elmlər Akademiyasının Rəyasət Heyəti akademik Cəlal Əliyevi Azərbaycanda kənd təsərrüfatı bitki-lərinin fiziki-kimyəvi biologiyası sahəsində fundamental tədqiqatları və əldə etdiyi nailiyyət-lərinə görə AMEA-nın Həsən Bəy Zərdabi adina mükafati ilə təltif etmişdir.

Akademik Cəlal Əliyevin elmi fəaliyyəti kənd təsərrüfatı bitkilərinin, əsasən, buğdanın fotosintetik məhsuldarlığının nəzəri əsaslarının öyrənilməsinə həsr olunmuşdur. O fotosintez və fototənəffüs proseslərini kompleks şəkildə tədqiq etmişdir. Bu tədqiqatların dairəsi bitkilərin məhsuldarlığının fizioloji, biofiziki, biokimyəvi və molekulyar-genetik əsaslarını, eyni zamanda bitkilərin həyatının struktur–funksiolnal təşkilinin molekulyar səviyyədən başlayaraq, bütöv bitki və əkinə qədər bütün mərhələ və formalarında məhsuldarlıq proseslərinin öyrənilməsini əhatə edir.

Cəlal Əliyev Azərbaycanda fiziki-kimyəvi biologiya, xüsusən də biokimya və biofizika sahələrində tədqiqatları genişləndirərək, keçən əsrin 70-ci illərində Azərbaycanda biologiya elminin yeni istiqamətlərinin, o cümlədən, molekulyar biologiya, molekulyar genetika, gen və hüceyrə biotexnologiyası, riyazi biologiya, kompüter biologiyası və bioinformatikanın bünövrəsini qoymuş və əsaslı surətdə inkişaf etdirmişdir. Cəlal Əliyev bu sahədə böyük elmi məktəb yaratmışdır. Bu məktəbin yetişdirmələri bu gun həm Azərbaycanda, həmçinin MDB, ABŞ, Kanada, Yaponiya, Cənubi Koreya, Avstraliya, İsrail və Avropa ölkələrinin aparıcı elmi mərkəzlərində və universitetlərində uğurla çalışır, öz elmi nəticələri ilə geniş tanınaraq Azərbaycan xalqına şərəf gətirirlər.

Akademik Cəlal Əliyev eyni zamanda yüksək dən keyfiyyətinə və məhsuldarlığa malik, Azərbaycanın buğda əkini sahəsinin böyük hissəsini təşkil edən Qaraqılçıq-2, Vüqar, Şir Aslan-23, Bərəkətli-95, Əlincə-84, Tərtər, Qiymətli 2-/17, Əkinçı-84, Əzəmətli-95, Nurlu-99, Qırmızı gül, Ruzi-84, Qobustan-99 və s. kimi bərk *(Triticum durum* Desf.*)* və yumşaq *(Triticum aestivum* L.*)* buğda sortlarının müəllifidir.

## AMEA-NIN HƏSƏN BƏY ZƏRDABİ ADINA MÜKAFATI - İ.M. HÜSEYNOVA



Azərbaycan Milli Elmlər Akademiyasının Rəyasət Heyəti biologiya elmləri doktoru, professor, AMEA-nın müxbir üzvü İradə Hüseynovanı kənd təsərrüfatı sahəsində fundamental tədqiqatları və əldə etdiyi nailiyyətlərinə görə AMEA-nın Həsən bəy Zərdabi adına mükafatı ilə təltif etmişdir.

İ.M. Hüseynovanın elmi fəaliyyəti ali bitkilərin fotosintetik membranlarının əsas struktur-funksional komponentləri olan piqment-zülal komplekslərinin sintezi, yığılması və formalaşması proseslərinin molekulyar-genetik mexanizmlərinin kompleks şəkildə tədqiqinə, bitkilərin ekstremal şəraitə uyğunlaşmasında fotosintetik dəyişikliklərin mümkün rolunun müəyyənləşdirilməsinə və bitkilərin abiotik (quraqlıq, şoranlıq, radiasiya) və biotik (virus, fitoplazma, həşərat) streslərə qarşı davamlılığının müdafiə-adaptasiya proseslərinin əsaslarının aydınlaşdırılmasına həsr olunmuşdur. Tədqiqatların nəticələri çoxsaylı beynəlxalq miqyasda təqdim olunmuş, bir sıra nüfuzlu və yüksək impakt faktora malik olan jurnallarında («*Биохимия», "Photosynthetica", "J. of Fluorescence", "J. of Biochemistry and Molecular Biology", "Photosynthesis Research",* "Biochimica et Biophysica Acta – *Bioenergetics", "Plant Physiology and Biochemistry", "Advances in Biological Chemistry", "Journal of Life Sciences", "J .of General Virology")* və beynəlxalq nəşrlərində *("Nauka", "Springer", "Nova Publisher", "Dova Publisher")* dərc edilmiş və onlara dəfələrlə istinadlar olunmuşdur.

## AMEA-NIN AKADEMİK MİRƏSƏDULLA MİRQASIMOV ADINA MÜKAFATI - BÖYÜKKİŞİ AĞAYEV



Azərbaycan Milli Elmlər Akademiyasının Rəyasət Heyəti tibb elmləri doktoru, professor, akademik Böyükkişi Ağayevi Azərbaycanda səhiyyənin və tibb elminin fundamental və tətbiqi sahələrinin inkişafındakı çoxillik xidmətlərinə və əldə etdiyi nailiyyətlərə görə ilə AMEA-nın akademik Mirəsədulla Mirqasımov adına mükafatı ilə təltif etmişdir.